AZƏRBAYCAN RESPUBLİKASI TƏHSİL NAZİRLİYİ
GƏNCƏ DÖVLƏT UNİVERSİTETİ

**Konfrans Ümummilli Lider Heydər Əliyevin anadan olmasının 99- ci ildönümünə həsr olunub**

# MÜASİR TƏBİƏT VƏ İQTİSAD ELMLƏRİNİN AKTUAL PROBLEMLƏRİ

## BEYNƏLXALQ ELMİ KONFRANS

## II HİSSƏ

GƏNCƏ - 2022

*Ədəbiyyat*

1.Sultanov R.L. Təhsilalanların sağlamlığının qorunmasında və mühafizə edilməsində pedaqoji valeologiyanın imkanları :// Bakı Qızlar Universiteti " Elmi əsərlər". Bakı 2020 , cild II N3 (43) səh(7s 1s)

2.Sultanov R. L. Ətraf mühit və insan sağlamlığının qorunmasında valeoloji biliklərdən istifadənin imkan və yolları:// Humanitar elmlərin öyrənilməsinin aktual problemləri . Bakı Slavyan Universiteti əsərləri. Bakı 2021 N1 səh 258-260

3.Ümumtəhsil məktəblərinin altıncı sinif biologiya fənni üzrə dərslik ( Bakı-2017)- Yaşar Seyidli , Xumar Əhmədbəyli , Nailə Əliyeva .


## THE ESSENCE AND FORMATION OF VALEOLOGICAL KNOWLEDGE IN THE CONTEXT OF "HUMAN AND ITS HEALTH" IN THE SIXTH GRADE OF THE CURRICULUM IN THE SIXTH GRADE OF BIOLOGY


***Soltanov Rauf Lutfali oglu***

***Doctor of Biological Sciences, Professor***

***rsultanov@bk.ru***

***Azerbaijan State Pedagogical University***



***Reference***

Many of the subjects in biology taught in secondary schools provide valeological knowledge about human health.

It provides information about the importance of wildlife in human health, the characteristics of the study of valeological knowledge about human health and the main essence of valeological knowledge on the role of proper nutrition in human health.


## СУЩНОСТЬ И ПУТИ ФОРМИРОВАНИЯ ВАЛЕОЛОГИЧЕСКИХ ЗНАНИЙ ПО ПРЕДМЕТУ БИОЛОГИЯ В ШЕСТОМ КЛАССЕ УЧЕБНОЙ ПРОГРАММЫ «В СВЯЗИ С ЧЕЛОВЕКОМ И ЕГО ЗДОРОВЬЕМ»


***Резуме***

Многие предметы биологии, преподаваемые в общеобразовательных школах, дают валеологические знания о здоровье человека.

Приводятся сведения о значении живой природы для здоровья человека, особенности изучения валеологических знаний о здоровье человека и основная суть валеологических знаний о роли правильного питания в здоровье человека.


# ARAZBOYU DÜZƏNLİKDƏ MÜXTƏLİF CİNS QOYUNLARIN BABEZİOZU ZAMANI QANDA GEDƏN MORFOLOJİ VƏ BİOKİMYƏVİ DƏYİŞİKLİKLƏR


***b.ü.f.d. Seyidov M.***

***Naxçıvan Dövlət universiteti***

**vasifseyidov72@gmail.com**



**Açar sözlər:** *babezioz, balbas, mazex, prekos,gənə, qan-parazitar, xəstəlik*

**Ключевые слова:** *бабезиоз, бальбас, мазех, прекос, кровепаразиты, заболевание*

**Keywords:** *babesios, balbas, mazex, prekos, blood-parasitic*


Qan-parazitar xəstəliklərinin Naxçıvan Muxtar Respublikası şəraitində geniş yayılmasının başlıca amillərindən biri də burada müxtəlif iqlim şəraiti və coğrafi zonalarda bu

xəstəliklərin keçiriciləri hesab olunan iksodide ailəsinə məxsus gənələrin geniş yayılmasıdır. Muxtar respublikanın təbii coğrafi iqlim şəraiti gənələrin inkişafı üçün əlverişli olmaqla yanaşı, burada onların təbii inkişaf tsiklinin başa çatmasında mühüm rol oynayan aralıq sabiblərinin geniş məskunlaşması da mühüm rol oynayır [2].
İksodide gənələrinin inkişafına təsir edən amillərdən biri də atmosfer yağıntılarıdır. Çünki gənələrin inkişafında nəmliyin olması mühüm rol oynayır. Naxçıvan MR-də yağıntı qeyri- bərabər paylanır. Yüksəklikdən asılı olaraq yağıntıların miqdarı kəskin dəyişə bilir [1]. Muxtar respublikada əsasən balbas və mazex cins qoyunlar yetişdirilir. Balbas cins qoyunlar qan-parazitar xəstəliklərinə çox həssas olub, xeyli təlafat verir [4]. Balbas və mazex cins qoyunların bu xəstəliklərə həssas olmasının əsas səbəblərindən biri də qoyunlar arasında uzun müddət yaxın qohumluq əlaqəsi olan çarpazlaşdırma olmuşdur. Çünki belə hallar orqanizmin irsi konstitusional xüsusiyyətlərinin zəifləməsinə səbəb olduğundan xarici mühitin mənfi təsirlərinə, yoluxucu və parazitar xəstəliklərə qarşı müqavimətsiz olur.

**MATERIAL VƏ METOD**

Muxtar respublika şəraitində yetişdirilən müxtəlif qoyun cinslərinin (balbas, mazex və bu cinslərin çarpazlaşmasından əldə olunan mələzlərin) babezioza yoluxması və bu zaman qanda baş verən morfoloji və biokimyəvi dəyişiklikləri öyrənmək üçün hər cinsdən 20 baş qoyun olmaqla 3 qrup heyvan üzərində yoxlamalar təcrübə apardıq. Hər qrupa daxil olan heyvanları iki yarım qrupa bölməklə bir yarımqrupda heyvanları süni yolla yoluxdurduq, digər yarımqrupda isə təbii yoluxma üçün müvafiq şərait yaratdıq. Heyvanlar yoluxdurulmamışdan əvvəl onların qan yaxması mikroskopik olaraq qan-parazitar xəstəliklərinə görə yoxlanıldı və tam sağlam heyvanlardan təcrübədə istifadə olundu. Digər tərəfdən təcrübə heyvanlarının hər birinin qanı biokimyəvi analiz edilib ümumi azotun, qalıq azotun, albuminlərin, qlobulinlərin, qanda hemoqlobinin, eritrositlərin, leykositlərin normada miqdarı müəyyən edilərək xüsusi jurnalda qeyd edildi [6] .
Bunun üçün qan yaxmalarını Romanovski-Qimza üsulu ilə boyayaraq mikroskopiya etməklə, qan-parazitlərinin növünü, Sali üsulu ilə qanda hemoqlobinin, Qorayev kamerası ilə eritrositlərin və leykositlərin, refraktometrlə zülal və zülal fraksiyalarının miqdarını müəyyən etdik [5] .

**TƏDQIQATIN MÜZAKIRƏSI**

Müxtəlif yaş qrupundan olan qoyunların qan yaxmasının mikroskopik müayinəsi nəticəsində məlum olmuşdur ki, muxtar respublikada qoyunlar arasında babezioz digər qanparazitar xəstəliklərinə nisbətən daha geniş yayılmaqla bir yaşa qədər olanlar arasında yoluxmanın 91%-ni, iki yaşa qədər olan heyvanlar arasında 88%-ni, iki yaşdan yuxarı heyvanlar arasında isə 57%-ni təşkil edir [3].

***Histoqram. Qoyunların qan-parazitar xəstəliklərinin piroplazmidlərlə yoluxması***

Bütün qoyun cinsləri qan-parazitar xəstəliklərinə yoluxurlar. Lakin cins xüsusiyyətlərindən asılı olaraq xəstəliyi ağır və ya yüngül keçirirlər. Xəstəliyin inkubasiya dövrü balbas və mazexlərdə süni yoluxdurma zamanı 5-7 gün, təbii yoluxma zamanı isə 10-12 gün olmuşdur. Mələzlərdə isə müvafiq olaraq 6-7 və 10-12 gün çəkir.
Balbas və mazex qoyunlarda bədən hərarəti 41-420C-dək yüksəlmiş, nəbz 140-180, tənəffüsün dəqiqəlik sayı 40-75-ə qədər yüksəlmişdir. Bu vəziyyətdə heyvan yemdən imtina etmiş, gözün selikli qişalarında saralma, qəbizlik və sonralar ishal qeyd edilmişdir. Xəstəliyin 3-5 günlərində xəstə heyvanlar ayaqüstə durmur və yatır. Xarici mühitin qıcıqlarına cavab vermir. Su qəbulu azalır, getdikcə arıqlayır, vaxtında düzgün müalicə aparılmadıqda heyvan tələf olur.

Mələzlərdə temperatur 40-410C-dək yüksəlir, nəbzin dəqiqəlik vurğusu 120-125-ə, tənəffüs isə 30-70-dək yüksəlir. Ancaq onlar yem və su qəbul etmiş və arıqlama qeyd olunmamışdır. Mələzlər həm süni və həm də təbii yoluxma zamanı xəstəliyi yüngül keçirmiş və hətta müalicə olunmadan sağalma halları qeyd olunmuşdur. Balbas və mazex cins qoyunların yerli cins olmasına baxmayaraq xəstəliyi ağır keçirmiş və müalicə aparılmadıqda təlafat qeyd edilmişdir.
Xəstəlik dövründə qan yaxmalarının mikroskopiyası zamanı balbas və mazexlərdə 100 görünüş sahəsində parazitlərin miqdarı 220-380 olduğu halda, mələzlərdə 10- 25 parazit qeydə alınmışdır. Xəstəliyin ağır vaxtları balbas cins qoyunlarda eritrositlərin miqdarı 49,2-57,9%, hemoqlobinin miqdarı 38-42%, leykositlərin miqdarı isə 19-21% azalmışdır. Müvafiq olaraq mazex cins qoyunlarda bu nəticələr 46-57, 38-43, 24-31% təşkil etmişdir. Mələzlərdə isə bu göstəricilər 22-24, 20-24, 10-19% olmuşdur. Qeyd etmək lazımdır ki, qanda parazitlərin miqdarı nə qədər yüksək olarsa, qan elementləri də bir o qədər çox azalır. Leykositlərin qanda miqdarca azalması başqa komponentlərin dəyişilməsi ilə nəticələnir. O cümlədən zülal və zülali fraksiyalarının, sonda isə azot mübadiləsinin pozulması ilə müşayət olunur.
Babezioz zamanı zülal və zülal fraksiyalarının müxtəlif cins heyvanların qanında öyrənilməsi mühüm əhəmiyyət kəsb edir. Apardığımız tədqiqatların nəticələri göstərir ki, qoyunların babeziozunda ümumi zülalın və onun fraksiyalarının kəskin dəyişməsi müşahidə olunur. Xəstəliyin ağırlaşmış dövründə balbas qoyunlarda zülalın miqdarı 9-20%, mazexlərdə 5-16% azaldığı halda, mələzlərdə 3,5-10,3% azalır. Xəstəlikdən sağalma dövründə ümumi zülalın miqdarı normaya yaxın olur.
Xəstəlik zamanı qan zərdabında albuminlərin miqdarının azalması müşahidə edilir. Belə ki, xəstəliyin ağır gedişi zamanı balbaslarda albuminlərin miqdarının 5-5,09%, mazexlərdə 4,9-5,9%, mələzlərdə isə 2,9-6,3% azalması qeyd olunmuşdur.
Alfa qlobulin balbaslarda 2,4-3%, mazexlərdə 0,3-3,2% yüksəldiyi halda, mələzlərdə 0,3-2,9% azalır. Hansı ki, bu xəstəlik dövründə orqanizmdə iltihabı prosesin zəif və ya güclü getməsinin göstəricisi hesab olunur. Mələzlərdə alfa qlobulinlərin azalması iltihabı prosesin zəif getdiyini göstərir. Xəstəliyin gedişi dövründə beta-qamma qlobulinlərin miqdarı çoxalır. Balbas cins qoyunlarda 0,7-3,05%, mazexlərdə 1,72-3,5%, mələzlərdə 1,02-3,02% artım qeyd olunur. Albuminin qlobulin nisbəti azalır.
Aparılan tədqiqatlardan məlum olur ki, Naxçıvan Muxtar Respublikasının Arazboyu ərazilərində iksodid gənələrinin inkişafı üçün əlverişli şəraitin olması burada qoyunlar arasında qan-parazitar xəstəliklərinin geniş yayılmasına səbəb olur. Belə ki, bir yaşa qədər olan heyvanlar arasında 91%, iki yaşadək heyvanlar arasında 88%, iki yaşdan yuxarı olan heyvanlar arasında 57% babezioza yoluxma müşahidə olunur.
Babezioza yoluxmuş heyvanların qanında eritrositlərin, hemoqlobinin, leykositlərin, zülal və zülal fraksiyalarının miqdarında kəskin dəyişikliklərlə müşahidə edilir və bu qoyunların cinsindən asılı olaraq müxtəlif səviyyədə nəzərə çarpır. Bu cür kəskin dəyişikliklər ən az mələzlərdə müşahidə olunur.

***Ədəbiyyat***

1.Babayev S. Naxçıvan Muxtar Respublikasının coğrafiyası. Bakı: Elm, 1999, 226 s.
2.Seyidov M.A. Naxçıvan Muxtar Respublikasının iksodofaunası. B.ü.f.d....dis.avtoref. Naxçıvan, 2018, s. 17.
3.Сейидов М. А. Фауна иксодовых клещей и ее роль в передаче кровепаразитарных болезней овец в условиях Нахчыванской АР/ Müasit təbiət və iqtisadi elmlərinin aktual

problemləri beynəlxalq elmi konfransının materialları (04-05 may). Gəncə: Gəncə Dövlət Universitetinin nəşriyyatı, 2018,II hissə, s.272-275.
4.Zamanov İ.B. Qoyunların piroplazmidozları (qızdırma xəstəlikləri) və onlara qarşı müalicə profilaktika tədbirləri. Naxçıvan, 2005. s. 9-15.
5.Лабораторные исследования в ветеринарии. Под ред. В.Я.Антонова и П.Н. Блинова. М.: 1971. ст. 420-480.
5.Кудрявцев А.А. Исследование крови в ветеринарной диагностике. ГИСЛ. М.:1952

**MORPHOLOGICAL AND BIOCHEMICAL CHANGES IN THE BLOOD DURING THE BABEZIOSIS OF SHEEP OF DIFFERENT BREEDS IN THE ARAZBOY PLAIN**

***Seyidov M.***

Research shows that the existence of favorable conditions for the development of ixodidae ticks in the Arazboyu regions of the Nakhchivan Autonomous Republic leads to the spread of blood-parasitic diseases among sheep. Thus, 91% of animals under one year of age, 88% of animals under two years of age, and 57% of animals over two years of age are infected with babesiosis.
In the Autonomous Republic, balbas, mazex breeds and crosses of these breeds with fine wool prekos are grown. Like all sheep breeds, these breeds and their breeds are highly susceptible to blood-borne parasitic diseases.
Studies have shown that squirrels are more resistant to babesiosis than the balbas and mazex breeds, are more susceptible to the disease, and often result in recovery.
Babesiosis is characterized by sharp changes in the amount of erythrocytes, hemoglobin, leukocytes, proteins and protein fractions in the blood of infected animals, and this is noticeable at different levels depending on the sex of the sheep. Such drastic changes are observed in at least some cases. From the above, it can be concluded that more resistant to blood-parasitic diseases should be preferred to prevent long-term cross-breeding between sheep.

**МОРФОЛОГИЧЕСКИЕ И БИОХИМИЧЕСКИЕ ИЗМЕНЕНИЯ В КРОВИ ПРИ БАБЕЗИОЗЕ ОВЕЦ РАЗНЫХ ПОРОД ПРИАРАКСИНСКОЙ РАВНИНЫ**

***Сейидов М.***

Исследования показывают, что наличие благоприятных условий для развития иксодовых клещей в приараксинской районах Нахчыванской АР приводит к распространению среди овец кровепаразитарных заболеваний. Так, бабезиозом заражены 91% животных в возрасте до одного года, 88% животных в возрасте до двух лет и 57% животных в возрасте старше двух лет.
В АР выращивают породы бальбас, мазех и помеси этих пород с тонкорунными прекосами. Как и все породы овец, эти породы и их породы очень восприимчивы к передающимся через кровь паразитарным заболеваниям. Исследования показали, что белки более устойчивы к бабезиозу, чем породы балбас и мазех, более восприимчивы к заболеванию и часто выздоравливают.
Для бабезиоза характерны резкие изменения количества эритроцитов, гемоглобина, лейкоцитов, белков и белковых фракций в крови зараженных животных, причем это заметно на разных уровнях в зависимости от пола овец. Такие резкие изменения наблюдаются по крайней мере в некоторых случаях. Из выше изложенного можно сделать вывод, что следует отдавать предпочтение более устойчивым к кровепаразитарным заболеваниям, чтобы предотвратить длительное межпородное